"Azərbaycan Dövlət Pedaqoji Universitetinin mətbu orqanı"

# GƏNC MÜƏLLİM QƏZETİ



H.Əliyev
"Müəllimlər müəllimi olmaq ikiqat şərəfli və eyni zamanda, ikiqat məsuliyyətli işdir!"




ADPU 100

## AZƏRBAYCAN DÖVLƏT PEDAQOJİ UNİVERSİTETİNİN 100 İLLİK YUBİLEYİ QEYD OLUNUB

*Dekabrın 17-də Heydər Əliyev Mərkəzində Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) 100 illik yubileyi münasibəti ilə təntənəli mərasim keçirilib.*

*Mərasimdə Prezident Administrasiyasının Humanitar siyasət, diaspor, multikulturalizm və dini məsələlər şöbəsinin müdiri Fərəh Əliyeva, baş nazirin müavini Əli Əhmədov, təhsil naziri Emin Əmrullayev, xarici işlər naziri Ceyhun Bayramov, Hesablama palatasının sədri Vüqar Gülməmmədov, Milli Məclisin deputatları, dövlət və hökumət rəsmiləri, xarici ölkələrin Azərbaycandakı səfirliklərinin nümayəndələri, AMEA-nın üzvləri, ali təhsil müəssisələrinin rektorları, habelə respublika elmi-pedaqoji ictimaiyyətinin nümayəndələri iştirak ediblər.*







səh.2




## AZƏRBAYCAN DÖVLƏT PEDAQOJİ UNİVERSİTETİNİN ƏMƏKDAŞLARININ TƏLTİF EDİLMƏSİ HAQQINDA AZƏRBAYCAN RESPUBLİKASI PREZİDENTİNİN SƏRƏNCAMLARI

səh.6

## AZƏRBAYCAN DÖVLƏT PEDAQOJİ UNİVERSİTETİNİN ƏMƏKDAŞLARININ TƏLTİF EDİLMƏSİ BARƏDƏ AZƏRBAYCAN RESPUBLİKASI TƏHSİL NAZİRİNİN ƏMRİ



səh.7

### Rektor Cəfər Cəfərovun yubiley münasibətilə AZƏRTAC-a müsahibəsi



səh.4

### Yubiley nəşrləri




səh.8

Qəzet 1958-ci il, fevral ayının 1-dən etibarən nəşr olunur.

63

Dekabr, 2021 / № 07 (1110)

# AZƏRBAYCAN DÖVLƏT PEDAQOJİ UNİVERSİTETİNİN 100 İLLİK YUBİLEYİ QEYD OLUNUB

Dekabrın 17-də Heydər Əliyev Mərkəzində Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) 100 illik yubileyi münasibəti ilə təntənəli mərasim keçirilib.

Mərasimdə Prezident Administrasiyasının Humanitar siyasət, diaspor, multikulturalizm və dini məsələlər şöbəsinin müdiri Fərəh Əliyeva, baş nazirin müavini Əli Əhmədov, təhsil naziri Emin Əmrullayev, xarici işlər naziri Ceyhun Bayramov, Hesablama palatasının sədri Vüqar Gülməmmədov, Milli Məclisin deputatları, dövlət və hökumət rəsmiləri, xarici ölkələrin Azərbaycandakı səfirliklərinin nümayəndələri, AMEA-nın üzvləri, ali təhsil müəssisələrinin rektorları, habelə respublika elmi-pedaqoji ictimaiyyətinin nümayəndələri iştirak ediblər.

Tədbirdə əvvəlcə Dövlət Himni səsləndirilib, Vətən müharibəsi şəhidlərinin xatirəsi bir dəqiqəlik sükutla anılıb.

Yubiley mərasimində çıxış edən ADPU-nun rektoru professor Cəfər Cəfərov Prezident İlham Əliyevin "Azərbaycan Dövlət Pedaqoji Universitetinin 100 illik yubileyinin qeyd edilməsi haqqında" Sərəncamında ADPU-nun zəngin və məhsuldar inkişaf yoluna xüsusi qiymət verildiyini diqqətə çatdırıb. Son illər ərzində ali təhsil müəssisəsində görülən işlərdən və aparılan islahatlardan, əldə olunan nəticələrdən danışıb.



Rektor bildirib ki, müstəqillik dönəmində ADPU-nun yubileyləri keçirilib. Amma ilk dəfədir ki, yubiley tədbirini təcavüzkar Ermənistanı diz çökdürmüş qalib dövlətin vətəndaşları kimi, torpaqları işğaldan azad olunmuş qalib xalqın nümayəndələri kimi böyük sevinc və iftixarla qeyd edirik. Bu sevinci, bu qüruru bizə yaşadan Müzəffər Ali Baş Komandanımız və rəşadətli ordumuz olub. Fəxr edirik ki, misli görünməmiş Zəfərin qazanılmasına universitetimizin tələbə və məzunları da töhfə veriblər. Yetirmələrimizdən təqribən 200 nəfəri ön cəbhədə vuruşub, onlarca məzunumuz qazi olub, 12 nəfər şəhidlik zirvəsinə yüksəlib.

1921-ci ildə cəmi 6 tələbə və 8 müəllimlə Ali Pedaqoji Kişi İnstitutu adı altında fəaliyyətə başlayan universitetimiz bu gün 18600 nəfərdən çox tələbəsi, 1684 nəfərlik professor-müəllim və inzibati-texniki heyəti ilə ölkənin ikinci böyük ali təhsil ocağına çevrilib. Son 100 ildə ADPU-nu 160 mindən çox tələbə bitirib ki, onlar da istər təhsil, istərsə də digər sahələrdə Azərbaycanın ümumi inkişafına, sosial-iqtisadi və mədəni tərəqqisinə kifayət qədər sanballı töhfələr veriblər.

Son illər cəmiyyət həyatının bütün sahələrində aparılan köklü və sistemli islahatlar təhsil sahəsində də özünü göstərib. İslahatlar, ilk növbədə, təhsilin bütün pillələrində məzmun və bazanın yenilənməsinə, yüksək intellektli, geniş dünyagörüşlü, yaradıcı təfəkkürlü, praktik səriştəli və vətənpərvər ruhlu gənclərin yetişdirilməsinə yönəlib. Sadalanan istiqamətlərin hər birində nisbətən qısa zaman kəsiyində nəzərəçarpacaq dəyişikliklər baş verib, danılması mümkün olmayan uğurlar qazanılıb.

İcrası bu il başa çatan Strateji inkişaf planımıza uyğun olaraq, məzmunun yenilənməsi, tədris və imtahan prosesinin maksimum şəffaflaşdırılması, yeni nəsil təhsil proqramlarının hazırlanması, elmi-tədqiqatların səmərəliliyinin artırılması, beynəlxalq əlaqələrin genişləndirilməsi və infrastrukturun təkmilləşdirilməsi vasitəsilə təhsilin keyfiyyətinin yüksəldilməsinə nail olmaq əsas hədəflərimizdən olub.

Son illər Azərbaycan Dövlət Pedaqoji Universitetində bir neçə yeni layihənin icrasına başlanılıb. Bunlardan birincisi "2019-2023-cü illər üçün Azərbaycan Respublikasında ali təhsil sisteminin beynəlxalq rəqabətliliyinin artırılması üzrə Dövlət Proqramı" çərçivəsində ABŞ-ın Corc Vaşinqton Universiteti ilə uğurla davam edən ikili diplom proqramıdır. Hazırda 50 gəncin magistratura təhsili aldığı bu proqram üzrə cari tədris ilinin sonunda ilk məzun buraxılışı olacaq, növbəti ildən isə qəbul planını 25 nəfərdən 40 nəfərədək artırmaq





nəzərdə tutulur. Razılıq hissilə deyə bilərəm ki, proqram bizə dünyaca məşhur Corc Vaşinqton Universitetinin təhsil elmləri sahəsindəki zəngin təcrübəsindən faydalanmaq üçün geniş imkanlar yaradır.

Məzmunun yenilənməsi və müəllimlərin bacarıqlarının artırılması sahəsində Təhsil Nazirliyinin dəstəyi ilə "Tvinninq" layihəsi çərçivəsində 4 ixtisas pilot olaraq akkreditasiyadan keçirilib. Təhsil İnstitutu ilə birgə 3 ixtisasın məzmunu yenilənib. Heydər Əliyev Fondunun Regional İnkişaf İctimai Birliyi ilə inklüziv təhsil layihəsi çərçivəsində müəllimlər üçün təlimlər təşkil olunub, müvafiq dərslik xarici dildən tərcümə və çap edilib. 2020-ci ildən etibarən bütün ixtisaslar üzrə "İnklüziv təhsil" fənni tədris planına daxil edilib. Təhsil Nazirliyi və Təhsil İnstitutunun köməyi ilə müəllimlərimiz STEAM təlimi alıb, müvafiq STEAM laboratoriyaları yaradılıb və STEAM dərsləri 8 ixtisas üzrə tədris planına salınıb. ABŞ səfirliyi və Azərbaycan Müəllim İnkişaf Mərkəzi ilə birlikdə ingilis dili müəllimləri üçün TKT təlimləri keçirilib, müəllimlərin işə qəbulunda seçki mexanizminin real tətbiqi sayəsində yeni təfəkkürlü gənc müəllimlər universitetə daha geniş şəkildə cəlb edilib və sair tədbirlər yerinə yetirilib. Hazırda ADPU-da 22 ixtisas üzrə Azərbaycan bölməsi ilə yanaşı, son illər ixtisas sayı 3-dən 10-a çatdırılan rus bölməsi də fəaliyyət göstərir. Eyni zamanda, cari tədris ilində bakalavr səviyyəsində ibtidai sinif və riyaziyyat müəllimliyi ixtisasları üzrə ingilis bölməsi açılıb.

Ali məktəbin əsas reytinq göstəricilərindən birincisi yetirmələrinin əmək bazarında yer tapmasıdır. Bu baxımdan, son illərdə Azərbaycan Dövlət Pedaqoji Universitetinin məzunlarının müəllimlərin işə qəbulu (MİQ) və magistraturaya qəbul imtahanlarında göstərdikləri nəticələri qənaətbəxş saymaq olar.

Ötən tədris ilində ADPU-dan bakalavr səviyyəsində 2119 nəfər məzun olub. Məzunlarımızın 873-ü magistraturaya imtahan verib, onlardan 353-ü yetərincə bal toplayaraq qəbul olunub. Bu il ADPU məzunlarının MİQ imtahanlarındakı nəticələri də uğurlu olub. Belə ki, magistraturaya qəbul olanlar və hərbi xidmətə yollananlar istisna olmaqla, universiteti bitirmiş 2119 bakalavrdan 1306-sı həmin imtahanlarda iştirak edib, onlardan 1089 nəfəri 30-dan yuxarı bal toplayıb. Qəbul olanlardan 530 nəfər 40-60, 184 nəfər isə 50-60 bal yığaraq yüksək nəticə göstərib. Cəmi bir neçə il əvvəllə müqayisədə bu göstərici bəzi ixtisaslar üzrə 4-5, bəzilərində isə 7-8 dəfə yaxşılaşma deməkdir.

Yubiley başa vurduğumuz 100 ilə və xüsusən də cari vəziyyətə baxaraq nəticə çıxarmaqla yanaşı, həm də gələcək üçün ciddi planlar qurmaq vəzifəsini



qarşıya qoyur. Sözsüz ki, ADPU-nun mövcud vəziyyətində də müasir pedaqogikanın və təhsil elmlərinin ortaya çıxardığı ciddi tələblər, dəyişilməsi, müasirləşməsi tələb olunan kifayət qədər işlər var. Elm, təhsil və texnologiyaların misli görünməmiş sürətlə inkişaf etdiyi XXI əsrdə milli-mənəvi dəyərlərə bağlı, Vətənə və dövlətə sadiq, yaradıcı təfəkkürlü və müasir dünyagörüşlü, dərin savadlı və praktik səriştəli, rəqəmsal və xarici dil biliklərinə sahib olan gənc mütəxəssislər və fəal vətəndaşlar yetişdirmək əsas hədəflərimizdəndir. Biz çalışırıq ki, yetirmələrimiz elmi-texnoloji nailiyyətləri dərindən mənimsəsinlər, lakin hazır məhsula aludə olmasınlar, onun yalnız istehlakçısı deyil, həm də istehsalçısı olmağa səy göstərsinlər. Hazırda qarşıda duran mühüm vəzifələrdən biri universitetimizin 2030-cu ilədək Strateji inkişaf planını müasir dövrün tələbləri nəzərə alınmaqla hazırlamaqdan və icra etməkdən ibarətdir. İnanıram ki, dövlətimizin dəstəyi ilə ADPU öz mövcudluğunun ikinci yüzilliyinə daha inamla və qlobal çağırışlara daha hazırlıqlı şəkildə daxil olacaq.

Tədbirdə çıxış edən təhsil naziri Emin Əmrullayev vurğulayıb ki, Pedaqoji Universitetin ölkədə istər təhsil, istərsə də elmin inkişafında müstəsna rolu olub.

Ardı 3-cü səhifədə

# YUBİLEY TƏNTƏNƏSİ

Universitetin məzunları həm təhsil, həm də çalışdıqları digər sahələrdə ölkənin ümumi inkişafına, sosial-iqtisadi və mədəni tərəqqisinə kifayət qədər sanballı töhfələr veriblər.

Nazir universitetin əldə etdiyi uğurlardan, habelə "2019-2023-cü illər üçün Azərbaycan Respublikasında ali təhsil sisteminin beynəlxalq rəqabətliliyinin artırılması üzrə Dövlət Proqramı" çərçivəsində ADPU-nun ABŞ-ın Corc Vaşinqton Universiteti ilə uğurla davam edən ikili diplom proqramının əhəmiyyətindən danışıb. Həmçinin ADPU-ya tələbə qəbulunun, eləcə də universitetin məzunlarının müəllimlərin işə qəbulu imtahanlarının nəticələrinin yüksək olduğunu bildirib.

Emin Əmrullayev deyib: "Son illər istər müəllimlərin işə qəbulu müsabiqəsi, istərsə də müəllimlik ixtisasına qəbulda statistik rəqəmlər artıb. MİQ vasitəsilə işə qəbul olan müəllimlərin sayı 18 min nəfərdən, təxminən 55-56 min nəfərə çatıb, yəni bu rəqəm 3 dəfə artıb. Bu da daha artıq rəqabət qabiliyyətli və keyfiyyətli müəllim seçmək imkanı yaradıb. Müəllimlik ixtisasının formatının və mənasının dəyişməsi çox vacibdir. XXI əsr müəlliminə XX əsr müəllimində olan bacarıqlarla yanaşı, əlavə bacarıqlar da tələb olunur, artıq yeni bacarıq tələbləri də var".

Nazir vurğulayıb ki, ali məktəbin məzunlarının bir qismi fəaliyyətini işğaldan azad edilmiş ərazilərdə davam etdirəcək. Bu, yeni nəslin hazırlanması baxımından vacib və ümidverici məqamdır.

Daha sonra çıxış edən ADPU-nun gənc müəllimi, psixologiya üzrə fəlsəfə doktoru Səbinə Əlizadə və tələbələr adından IV kurs tələbəsi, TGT sədri İsmayıl Nəsirov Pedaqoji Universitetdə gənclərə yaradılan şəraitdən, ADPU tələbələrinin ölkəmizin ictimai həyatındakı aktiv iştirakçılığından söz açıblar.

Mərasimdə ADPU-nun 100 illiyinə həsr olunmuş "ADPU 100 il" sənədli filmi nümayiş edilib.

Bədii hissədə ADPU-nun tələbə xorunun ifasında universitetin himni səsləndirilib, tanınmış incəsənət ustalarının və tələbə incəsənət kollektivlərinin təqdimatında ədəbi kompozisiya və konsert proqramı təqdim edilib.

Qeyd edək ki, eyni zamanda mərasim boyu universitetin elmi-pedaqoji fəaliyyətini əks etdirən rəsm və kitab sərgisi keçirilib.

*QR kodu skan edərək təntənəli yubiley mərasimini izləyə bilərsiniz.*















# REKTOR CƏFƏR CƏFƏROV: "PEDAQOJİ UNİVERSİTETİN 100 İLLİK YUBİLEYİNİ QALİB XALQIN NÜMAYƏNDƏLƏRİ OLARAQ QÜRUR HİSSİ İLƏ QEYD EDİRİK."



*Bu il Azərbaycan Dövlət Pedaqoji Universitetinin 100 yaşı tamam olur. Milli düşüncənin inkişafına, pedaqoji və elmi-pedaqoji kadrların hazırlığına əvəzsiz töhfələr verən universitet bu gün də ölkəmizin ali təhsil sistemində ön sıralardadır və fəaliyyətini dövrün tələbləri istiqamətində qurur. Əlamətdar yubiley münasibətilə Azərbaycan Dövlət İnformasiya Agentliyi - AZƏRTAC-ın universitetin rektoru professor Cəfər Cəfərovla müsahibəsini qəzetimizin oxucularına təqdim edirik.*

**– Azərbaycan Dövlət Pedaqoji Universiteti çətin, mürəkkəb və şərəfli bir yol keçib. Ali təhsil ocağının tarixinə qısa ekskursiya etməyimiz, zənnimcə, izləyicilərimiz üçün maraqlı olardı.**

– Azərbaycan Dövlət Pedaqoji Universiteti ölkəmizin qocaman universitetlərdən biridir və ilk azərbaycandilli ali təhsil ocağıdır. İndi təsəvvür etmək çətindir, lakin vaxtilə Pedaqoji Universitet 6 tələbə və 8 müəllimlə fəaliyyətə başlayıb. Doğrudur, Cümhuriyyət dövründə Pedaqoji Universitetin yaradılması ilə bağlı fikirlər olmuşdu. Lakin cəmi 23 ay ömrü olmuş milli hökumət bu işə başlaya bilmədi. 1921-ci ildə Azərbaycan Xalq Komissarları Sovetinin sədri Nəriman Nərimanovun dekreti ilə Azərbaycan Pedaqoji Kişi İnstitutu təsis edildi. Sonra Ali Qadın Pedaqoji Məktəbi yaradıldı, daha sonra isə bu iki təhsil müəssisəsi birləşdirildi. Sonralar – bir müddət Bakı Dövlət Universitetinə birləşdirildi, yenidən müstəqil fəaliyyət göstərdi. İkinci Dünya müharibəsinin çətinliklərindən keçdi, fəaliyyətinin yeni mərhələsinə başladı. Bu müddət ərzində Pedaqoji Universitet Azərbaycanın mədəni və təhsil həyatında, ziyalı mühitinin formalaşmasında, müəllim kadrların hazırlanmasında əhəmiyyətli rol oynayıb. 100 il ərzində 160 mindən çox yüksəkixtisaslı müəllim kadrları hazırlayıb. Təkcə Azərbaycan üçün deyil, Gürcüstan, Mərkəzi Asiya respublikaları, Bolqarıstan və digər ölkələr üçün də müəllim kadrları hazırlayıb.

**– Bu əlamətdar gündə 100 yaşlı təhsil və elm məbədinin məşhur məzunlarını da yada salmaq yerinə düşər. Burada hansı məşhur alimlər həm də pedaqoji fəaliyyətlə məşğul olub?**

–Onu deyim ki, yubiley ərəfəsində universitetimiz tərəfindən bir çox kitablar hazırlanıb. "Azərbaycan Dövlət Pedaqoji Universitetinin 100 məşhur məzunu", "Azərbaycan Dövlət Pedaqoji Universitetinin professorları", "Azərbaycan Dövlət Pedaqoji Universitetinin rektorları", "Azərbaycan Dövlət Pedaqoji Universitetinin tarixi" (2 cilddə), "Pedaqoji Universitetin qəhrəmanları" və digər nəşrlər. "Azərbaycan Dövlət Pedaqoji Universitetinin 100 məşhur məzunu" kitabının mündəricatına baxmaq söhbətin kimlərdən getdiyi haqqında kifayət qədər təsəvvür yaradır.

Böyük fəxrlə deyə bilərik ki, Azərbaycan Milli Elmlər Akademiyasının 11 prezidentindən üçü - Yusif Məmmədəliyev (2 dəfə), Zahid Xəlilov və Həsən Abdullayev, 5 vitse-prezidenti - Heydər Hüseynov, Səməd Vurğun, Zahid Xəlilov, Əlisöhbət Sumbatzadə və İsa Həbibbəyli bizim universitetin məzunlarıdır. Həmid Araslı, Feyzulla Qasımzadə, İbrahim İbrahimov, Əşrəf Hüseynov, Məcid Rəsulov, Məmməd Arif Dadaşzadə, Məmməd Cəfər Cəfərov, Məmmədağa Şirəliyev - onların hər biri ayrı-ayrı sahələr üzrə məktəb yaradıb. Budaq Budaqov, Bahadur Tağıyev, Cavad Abdinov, Vaqif Abbasov, Qərib Məmmədov, İsmayıl Hacıyev universitetimizin məzunlarıdır. SSRİ Pedaqoji Elmlər Akademiyasının həqiqi üzvü, uzun müddət Azərbaycanın təhsil naziri işləmiş Mehdi Mehdizadə universitetimizin məzunu olub. Sovet İttifaqı Qəhrəmanı Mehdi Hüseynzadə də Pedaqoji Universitetin yetirməsi olub. Məzunlarımız arasında Sosialist Əməyi Qəhrəmanları, əməkdar müəllimlər də var. Dövlət xadimləri Şıxəli Qurbanov, Milli Məclis sədrinin müavini Fəzail İbrahimli, generallar Əli Nağıyev, Vəli Nağıyev, Vidadi Əliyev, əməkdar elm xadimləri, əməkdar müəllimlər Cəfər Xəndan, Əli Sultanlı, Məmmədhüseyn Təhmasib universitetin məzunlarıdır. Qocaman müəllimlərimiz öz müəllimləri kimi bu adamların adını çəkəndə indi də həyəcanla danışırlar.

Tanınmış şair və yazıçılar, o cümlədən Əhməd Cavad, Mikayıl Müşfiq, Süleyman Rəhimov, Mirvarid Dilbazi, Mehdi Hüseyn, İsmayıl Şıxlı, İlyas Əfəndiyev, Məmməd Araz, Qılman İlkin, Əbülhəsən Ələkbərzadə, Qabil, Əhməd Cəmil, Mədinə Gülgün, İlyas Tapdıq, bəstəkarlar Səid Rüstəmov, Oqtay Rəcəbov, Nailə Mirməmmədli ADPU-nun məzunlarıdır. Habelə Azərbaycanın Milli Qəhrəmanları arasında da universitetimizin məzunları var. Vətən müharibəsində torpaqlarımızın düşməndən azad olunması uğrunda canlarından keçmiş şəhidlərimizdən 12 nəfəri müxtəlif illərdə ADPU-nu bitirib.

Bu nəşrlər bir qədirşünaslıq nümunəsidir. Yubiley ərəfəsində, həmçinin film çəkilib. Azərbaycan Respublikasının Prezidenti cənab İlham Əliyevin "Azərbaycan Dövlət Pedaqoji Universitetinin 100 illik yubileyinin qeyd edilməsi haqqında" Sərəncamına uyğun olaraq, Bakıda və regionlarda onlayn, əyani və ya qarışıq formada müxtəlif səpkili tədbirlər keçirilib.

**– Ulu Öndər Heydər Əliyevin "Mən Yer üzündə müəllimdən yüksək ad tanımıram" kəlamı rəhbəri olduğunuz ADPU üçün, fikrimcə, xüsusi önəm daşıyır, bəlkə də bir məsuliyyət doğurur. Yeni yüzilliyə qədəm qoyan universitet gələcəyin müəllimlərinə hansı keyfiyyətləri aşılayır?**

– Universitetimizin yubileylərindən birində ulu öndər Heydər Əliyevin söylədiyi bu fikir müəllim əməyinə, müəllim adına verilən ən yüksək qiymətdir. Ulu öndər Azərbaycan müəlliminə yüksək dəyər vermiş, eyni zamanda, onların üzərinə böyük məsuliyyət qoymuşdur. Heydər Əliyevin Azərbaycana rəhbərlik etdiyi dövr Pedaqoji Universitetin 100 ilinin təxminən 30 ilini əhatə edir. Ümummilli Lider universitetimizdə dəfələrlə olub, yubiley tədbirlərində, qəbul imtahanlarında iştirak edib. Bunların hamısı qocaman müəllimlərimizin xatirələrindədir və onunla bağlı ayrıca kitab hazırlanır. Ulu öndərin xatirəsinə ehtiramın ifadəsi olaraq universitetimizdə Heydər Əliyev lektoriyası, Heydər Əliyev Muzeyi, ikinci korpusumuzda Heydər Əliyev Mərkəzi fəaliyyət göstərir.

Ulu öndərin müəllimliklə bağlı digər fikri də var: "Cəmiyyətin gələcək tərəqqisi bir çox cəhətdən indi gənclərimizə nəyi və necə öyrətməyimizdən asılı olacaqdır". Bu fikir indiki dövr üçün son dərəcə aktualdır. Çünki zaman dəyişib və biz gələcəyin müəllimlərini köhnə qaydalarla yetişdirə bilmərik. Bu gün gənclərin informasiya texnologiyalarına giriş imkanları bizim nəsillə müqayisədə ölçüyəgəlməzdir. Onlar istənilən məlumatı həmin texnologiyalar vasitəsilə çox qısa müddətdə əldə edə bilirlər. Bəs belə olan halda müəllim nəyi öyrədəcək? Vaxtilə müəllim bilik mənbəyi idi, məktəbdə biliyini uşaqlarla bölüşürdü, onların da başqa bir məlumat mənbəyi olmadığı üçün müəllimə heyrətlə baxırdılar. İndi isə müəllimin söylədiyi fikrə dair şagirdin də öz fikri ola bilər və s. Belə olan halda müəllimin funksiyası nədən ibarətdir? Məsələ ilə bağlı Pedaqoji Universitet çoxsaylı konfranslar, beynəlxalq tədbirlər, alimlərlə görüşlər keçirib. Bu, təkcə bizim universiteti deyil, ümumən pedaqoji ictimaiyyəti düşündürən bir məsələ olduğu üçün gəldiyimiz qənaət belədir: milli-mənəvi dəyərlərə sadiq, Vətənə və dövlətə bağlı, rəqəmsal və xarici dil biliklərinə, geniş və müasir dünyagörüşünə, sağlam və müstəqil maraq dairəsinə sahib olan gənclər yetişdirmək. Gənclərin xarici dil bilikləri olmalıdır, çünki dünyanın informasiya resurslarının Azərbaycan dilində olan hissəsi çox azdır. İndiki dövr üçün ingilis dilini normal səviyyədə bilmək lazımdır ki, dünyada baş verən prosesləri izləyə biləsən, eləcə də özünə aid olan məlumatları resurslardan götürüb istifadə edəsən. Lazım olan yerdən lazımi məlumatları götürüb istifadə etmək üçün informasiya texnologiyaları bilikləri də lazımdır.

Bəs müəllimin rolu nədir? Müəllim bu böyük biliklər, məlumatlar okeanında hələ bərkiməmiş, möhkəmlənməmiş gənclərə düzgün üzməyi bacarmağı öyrətməli, düzgün istiqamət göstərməlidir. Alimlər maraqlı hesablamalar aparıblar. Məsələn, Harvard Universitetinin hesablamalarına görə, tələbəyə verilən biliklər o, məzun olanda artıq köhnəlmiş olur. Deməli, söhbət ömürboyu təhsildən gedir. Sən tələbəni elə silahlandırmalısan ki, o, ömrü boyu öz bilik və bacarıqlarını artırmaq imkanına malik olsun. Başqa bir hesablamalara görə isə, indi tədris edilən ixtisaslar gələcəkdə sıradan çıxacaq və bu proses artıq getməkdədir. Gələcəkdə olacaq ixtisasları isə biz bilmirik. Biz bilmədiyimiz o ixtisaslar haqqında nə öyrədə bilərik? Tələbə daim öz üzərində işləməlidir. Milli Prioritetlərdə göstərildiyi kimi, 2030-cu ilə qədər XXI əsrin tələblərinə uyğun təhsil sisteminin formalaşdırılması əsas hədəflərdən biridir və bizim universitet də bunu əsas götürür.

**–Ali təhsil ocağı ənənəyə nə dərəcədə sadiqdir, yeniliyə nə dərəcədə açıqdır? Universitetdə aparılan islahatlar barədə məlumat verərdiniz.**

–Hər ikisi son dərəcə önəmlidir. Necə deyərlər, keçmişinə daş atanı gələcək topa tutar. Əlbəttə ki, universitetin, yaxud istənilən cəmiyyətin, qurumun fəaliyyətində yanlış təcrübə də olur və bunlar düzəldilməlidir. Eyni zamanda, dövrün tələbləri nəzərə alınmalıdır. Əgər sən dövrün tələblərinə uyğun olaraq yenilənməni aparmasan, o ənənələr səni xilas edə bilməyəcək. Ənənələrə sadiq, yeniliklərə açıq - bu, universitetimizin şüarıdır. Bir misal deyim. Ən yaxşı məqsədlər üçün universitetimizdə test üsulu ilə imtahanlar tətbiq olunmuşdu. Məqsəd şəffaflığa nail olmaq, subyektiv amili aradan qaldırmaq idi. Lakin sonradan məlum oldu ki, bu prosesdə də yanlış məqamlar olub və əslində ilkin məqsəddən daha çox

Ardı 5-ci səhifədə

yanlış məqamlar olub və əslində ilkin məqsəddən daha çox yanlış işlərə yönələn bir prosesə çevrilib.

Son illər universitetdə görülən işlərdən biri elə qiymətləndirmədə müəyyən yeniliklərin tətbiqidir. Həyata keçirilən yeniliklər həm məzmunu, həm də infrastrukturu əhatə edir. Məsələn, Azərbaycan Müəllimlər İnstitutu Pedaqoji Universitetə birləşdirildi. Bu birləşməni real olaraq həm tələbələr, həm də müəllimlər üçün əlavə gərginlik yaratmadan həyata keçirmək lazım idi. Biz bunu başa çatdırdıq. Bu gün artıq deyə bilərik ki, Azərbaycan Dövlət Pedaqoji Universiteti paytaxtımızdakı 4 tədris korpusu, Quba, Şamaxı, Şəki, Ağcabədi və Cəlilabaddakı filialları, tərkibindəki Azərbaycan Dövlət Pedaqoji Kolleci və Bakı şəhərindəki baza məktəbi ilə ölkənin ən böyük və şəbəkələşmiş ali təhsil müəssisəsidir. Universitetdə ümumilikdə 18 mindən artıq tələbənin təlimi ilə 1700-dək müəllim və inzibati-texniki heyət məşğul olur. Belə bir ahəngdar inkişafı təmin etmək üçün vaxtilə xeyli əmək sərf olunub. İslahatlar təkcə Bakıda deyil, ADPU-nun bütün filiallarında və nəzdindəki kollecdə davam etdirilir. Yaşlı həmkarlarımızın dediklərinə görə, aparılan yenilənmə tələbələr və müəllimlər tərəfindən məmnunluqla qəbul olunur.

Bakalavr proqramlarını əhəmiyyətli dərəcədə yenilədik. Təhsil nazirinin əmrinə əsasən, komissiya yaradılmışdı. Pedaqoji Universitetin rektoru o komissiyanın rəhbəri idi, universitetin əməkdaşları isə komissiyanın üzvlərinin əhəmiyyətli hissəsini təşkil edirdi. Biz pedaqoji təhsil sahəsində aparıcı müəssisəyik. Lakin ölkəmizin 21 ali məktəbində pedaqoji təhsil verilir. Bu proqramların yenilənməsi deyəndə, eyni zamanda, həmin təhsil müəssisələri üçün vacib olan proqramlardan da söhbət gedir. Onların da iştirakı ilə bu çətin proses uğurla başa çatdırıldı.

Pedaqoji Universitetin əhəmiyyətli işlərindən biri də beynəlxalq əlaqələrin genişlənməsidir. "2019-2023-cü illər üçün Azərbaycan Respublikasında ali təhsil sisteminin beynəlxalq rəqabətliliyinin artırılması üzrə Dövlət Proqramı" çərçivəsində iki ildir ABŞ-ın Corc Vaşinqton Universiteti ilə birgə magistratura səviyyəsində "Təhsil idarəçiliyi" ixtisası üzrə beynəlxalq ikili diplom proqramı həyata keçirilir və 50 gənc bu proqramda təhsil alır. Yayda proqram üzrə ilk məzunlarımız olacaq. Əlbəttə ki, proqramın vaxtı bitəndən sonra maliyyələşmə də dayanacaq. Biz davamlılığı təmin etmək üçün analoji istiqamətlərdə milli proqram üzrə də işlər aparırıq. "SABAH Magistratura" proqramının qəlibi olmuşuq və onu eksperiment olaraq bu ildən həyata keçiririk. Magistratura səviyyəsində MBA (təhsilin təşkili və idarə edilməsi), təlim və tədrisin təşkili və metodikası üzrə mütəxəssis hazırlığı da həyata keçirilir. Magistrdən söhbət düşmüşkən, fikrimizcə, bu proqramların əhəmiyyətli dərəcədə yenilənməsinə ehtiyac var. Bu sahədə də biz işlərimizi davam etdirəcəyik.

Bakalavr səviyyəsində mən bir neçə məsələni qeyd edə bilərəm. Bunlardan biri müəllimlərin imkanlarının, bacarıq və qabiliyyətlərinin artırılması istiqamətində təlimlərə cəlb olunmasıdır. İngilis dilini tədris edən 100-ə yaxın müəllim üçün ABŞ səfirliyi və Müəllim İnkişafı Mərkəzinin köməyilə ilkin imtahan keçirilib, TKT imtahanları keçirilib. Nəticədə həmin müəllimlərimizin imkanları əhəmiyyətli dərəcədə dəyişdi və biz struktur dəyişiklikləri də etdik.

STEAM bacarıqları olan yeni nəsil müəllimlərin hazırlanması yönündə işlər aparılır. ADPU-da STEAM laboratoriyası yaradılıb. Artıq 8 ixtisasda STEAM üzrə tədris aparılır.

Başqa bir işimiz xarici dillərdə tədrisin aparılmasıdır. Universitetdə 22 ixtisas üzrə bakalavr səviyyəsində tədris aparılır. Rus dilində tədris aparılan ixtisasların sayı vaxtilə üç idi, indi ona çatdırılıb. İbtidai sinif və riyaziyyat müəllimliyi ixtisasları üzrə ingilis bölmələri açılıb. Bunların da genişləndirilməsi nəzərdə tutulur. Tvininq layihəsi çərçivəsində dörd ixtisasın pilot olaraq akkreditasiyası keçirilib.

Artıq dördüncü ildir ki, keyfiyyət sisteminin bir aləti olaraq professor-müəllim heyətinin reytinq qiymətləndirilməsi həyata keçirilir. Bu, müsbət nəticələrini verməkdədir və bundan sonra, eyni zamanda, institusional qiymətləndirmə alətinin tətbiqi nəzərdə tutulur, yəni ən yaxşı kafedra, ən yaxşı fakültə və s. bu tipli meyarlar əsasında universitetin struktur bölmələrini müqayisəli şəkildə qiymətləndirmə imkanımız olacaq.

Həmçinin söhbət kitabxananın yenilənməsindən gedir. Məsələn, bir milyondan artıq kitab fondu olan Pedaqoji Universitetin kitabxanasının vəziyyəti o qədər də ürəkaçan deyildi. "BP Azerbaijan" şirkəti bu sahədə dəstək verir və bu yaxınlarda yenilənmiş kitabxananın açılışı nəzərdə tutulur. Bizim, həmçinin üç filialımız öz yubileyini qeyd edəcək. Çalışacağıq ki, həmin yubiley tədbirləri regionların elm, təhsil, mədəni həyatında bir hadisə kimi yadda qalsın.

**-Cəfər müəllim, siz reytinq qiymətləndirmə dediniz. Onun əməkhaqqıya təsiri olurmu?**

-Şübhəsiz. Bunun həyata keçirilməsi, əlbəttə ki, universitetin imkanlarına bağlıdır. Birinci dəfə reytinq qiymətləndirmə üzrə həvəsləndirmə ilk yüzlüyü əhatə edirdi. Həmin müəllimlərimizə əlavə 100 manat əməkhaqqı ödənilirdi. Növbəti ildə onu 150 nəfərə aid etdik, ödənişin də miqdarı bir qədər artırıldı. Bu məsələdə həm yerli, həm beynəlxalq təcrübəni öyrənirik və ən optimal vəziyyəti müəyyən edirik. Təkmilləşdirmələr davam edəcək. Ümumiyyətlə, motivasiyanın artırılması, rəqabət mühitinin yaradılması istənilən qurum üçün çox vacib məsələlərdir. Görülən işlərdən biri də müəllimlərin real seçkisinin həyata keçirilməsidir. Bu iş vaxtilə formal xarakter daşıyırdı. Biz real seçkini həyata keçirəndə elan edilən 114 yerə təqribən 500 nəfər sənəd vermişdi, bunun da 10 faizi kənardan idi. Elə qalib gələnlərin də təxminən 10 faizini kənardan olanlar təşkil etdi. Hazırda yalnız fakültə dekanları və kafedra müdirləri deyil, müəllim və tyutorlar da müsabiqə yolu ilə seçilirlər. Universitetin pedaqoji heyətinin yenilənməsi son dərəcə vacibdir. Bu, eyni zamanda, insanı məsuliyyətli olmağa, işini keyfiyyətlə görməyə yönəldir, dərk edir ki, yaxşı işləməsə, işini itirə bilər. Ümumiyyətlə, islahat çox ağrılı bir prosesdir. Sən özünə düşmən də qazanırsan. Lakin nədən ötrü aparılır? Həmin qurumun gələcəyi üçün.



Bu ilin qəbul nəticəsinə görə, tələbələrimizin 74 faizə qədəri 400-dən yuxarı bal toplayıb. Vaxt var idi ki, bura 400 bal ilə gələnlərə qəhrəman kimi baxılırdı. Tələbə kontingentinin təxminən 80 faizə qədəri bölgələrdəndir. Onlar öz rayonlarında, kəndlərində burada aparılan təhsil barədə danışırlar və o səbəbdən də axın olur. Digər tərəfdən, dövlətimiz müəllim peşəsinin nüfuzunun artırılması istiqamətində mühüm islahatlar aparıb, eləcə də yeni-yeni məktəblər tikilir, müəllimlərin əməkhaqqı artırılır. Nəticədə yüksək balla müəllim peşəsini seçənlərin sayı ildən-ilə çoxalır. Ötən tədris ilində 2119 nəfər məzun olub. Onların 873-ü (41,5 faiz) magistraturaya imtahan verib. Bir qismi hərbi xidmətə, bir qismi MİQ imtahanlarına gedib. Magistraturaya imtahan verənlərin 40 faizi yetərincə bal toplayıb və qəbul olub. Həmin o 2119 bakalavr məzunundan 1306-sı, yəni 61 faizi MİQ imtahanlarında iştirak edib (digər qismi magistraturaya və ya hərbi xidmətə gedib). 1306 nəfərdən 1089-u (83 faiz) 30-dan yuxarı bal toplayıb və işə qəbul olunub, onlardan 530 nəfər 40-60 bal, 184 nəfər 50-60 bal toplayıb. Elə ixtisaslar var ki göstəricilər son 4-5 il ərzində 4-5 dəfə, elə ixtisaslar var ki, 8-10 dəfə yüksəlib.

Bu il ADPU-nun qəbul planı 97,6 faiz dolub. Halbuki 21 ali təhsil müəssisəsində müəllim ixtisası üzrə qəbul həyata keçirilib. Yəni faktiki olaraq bunlar hamısı bizim rəqiblərimizdir. Qəbul olunanlardan 1730 nəfəri 400-dən yuxarı bal toplayıb. Qəbulun 66 faizi dövlət sifarişi əsasında həyata keçirilir. Bu da çox vacibdir. Həmçinin təhsil tələbə krediti də ölkəmizdə təhsilin hamı üçün əlçatanlığını təmin edir.

**-Keçən il Azərbaycan Vətən müharibəsini yaşadı... Pedaqoji Universitetin müəllimləri və məzunları Qarabağ zəfərinə nə kimi töhfə verdilər?**

-İki yüzədək tələbə və məzunumuz müharibədə iştirak edib. Onlar arasında şəhid də var, qazi də. ADPU-nun kollektivi şəhid olan məzunlarının xatirəsini əziz tutur, qazilərə ehtiramla yanaşır. Bu il universitetə qəbul olan tələbələrlə tanışlıq xarakterli görüşdə onlardan müharibədə iştirak edən qohum və ya yaxınlarının olub-olmaması ilə bağlı soruşulurdu. Biri deyir şəhid bacısıyam, digəri deyir əmim oğlu şəhid olub. Həmin auditoriyada dərs demək çox məsuliyyətli işdir. Söhbət məsələnin mənəvi tərəfindən gedir. Təbii ki, bu gün dövlət tərəfindən şəhid ailələrinə və qazilərə maddi kömək göstərilir. Lakin təhsil müəssisələri bunun mənəvi tərəfinə diqqət yetirməlidir. Müəllim bilməlidir ki, o uşaqların qarşısında dərs demək son dərəcə məsuliyyətli bir işdir. Onların şəhid və ya qazi olan yaxınlarının canı-qanı bahasına torpaqlarımız işğaldan azad edilib və müəllim də bu gün auditoriyada tədris aparır. Elə müstəqillik dövründə Pedaqoji Universitetin yubiley tədbirləri neçə dəfə keçirilib. Lakin 100 illik yubileyi Azərbaycan Dövlət Pedaqoji Universitetinin kollektivi qalib xalqın nümayəndələri olaraq, qamətini dik tutaraq qürurla qeyd edir. İnsan savadlı ola bilər, lakin kosmopolit olar. Gələcəyin müəllimlərinin vətənpərvər ruhda yetişdirilməsi inkişaf prosesinin çox vacib hissəsidir.

**- ADPU-nun yaxın illər üçün hansı hədəfləri var?**

- Hədəflərimiz əslində gördüyümüz işlərin davamıdır. 2021-ci ilə qədər olan strategiyanın davamını hazırlayırıq. O, 2030-cu ilədək olan dövrü əhatə edəcək. İkinci yüzildə dövrün çağırışlarına daha intensiv cavab verməklə fəaliyyət göstərməyimizi düşünürük. Universitetin beynəlxalq əlaqələrini daha da genişləndirəcək, beynəlxalq təcrübəni əhəmiyyətli dərəcədə öyrənəcək və o təcrübədən çıxış edərək müasir çağırışlara cavab verən insanların yetişdirilməsi üçün çalışacağıq.

Qarabağ Zəfəri tamamilə yeni bir müstəvidə fəaliyyət göstərməyimizi qarşımıza bir vəzifə kimi qoyur. Baxın, azad edilmiş ərazilərin inkişafı ilə bağlı hansı proseslər gedir; texnologiyalar, yeni yanaşmalar və s. Bunların hamısında, o cümlədən azad edilmiş ərazilərdə tikiləcək məktəblərdə işləyən adamlar da bu düşüncənin sahibləri olmalıdır. Çünki Azərbaycan dövləti indiyə qədər qarşıda duran ən əsas məsələni həll edib. Ona görə də cənab Prezidentin və zamanın qarşımızda qoyduğu vəzifələri layiqincə yerinə yetirmək üçün ordu lazımdır - yalnız silah yox, bacarıqlı, savadlı, vətənpərvər insanlar ordusu lazımdır ki, bu cənnət-məkan məmləkəti daha firavan vəziyyətə gətirib çatdırsın.

**-Maraqlı müsahibə üçün təşəkkür edirik.**

**16 dekabr 2021-ci il**

**QR kodu skan edərək müsahibənin videogörüntüsünü izləyə bilərsiniz.**






## AZƏRBAYCAN DÖVLƏT PEDAQOJİ UNİVERSİTETİNİN ƏMƏKDAŞLARININ TƏLTİF EDİLMƏSİ HAQQINDA AZƏRBAYCAN RESPUBLİKASI PREZİDENTİNİN SƏRƏNCAMI

Azərbaycan Respublikası Konstitusiyasının 109-cu maddəsinin 23-cü bəndini rəhbər tutaraq qərara alıram:

Azərbaycan Dövlət Pedaqoji Universitetinin 100 illiyi münasibətilə və Azərbaycanda təhsilin inkişafında xidmətlərinə görə Azərbaycan Dövlət Pedaqoji Universitetinin aşağıdakı əməkdaşları təltif edilsinlər:

**"Şöhrət" ordeni ilə**

Cəfərov Cəfər Məmməd oğlu

**3-cü dərəcəli "Əmək" ordeni ilə**

Cəbrayılov Məlikməmməd Saday oğlu
Əliyev Ramiz İbrahim oğlu
Qarayev Məmməd Abbas oğlu
Quliyev Elman Hilal oğlu
Rüstəmov Fərrux Abbas oğlu
Sultanov Oqtay Balaqədəş oğlu

**"Tərəqqi" medalı ilə**

Abdullazadə Nazilə Əbdül qızı
Allahmanov Mahmud Qara oğlu
Aslanov Eldar İkram oğlu
Əhmədova Naibə Əhmədağa qızı
Əliyev Rəcəb Əhməd oğlu
Əliyev Soltan Hüseyn oğlu
Əliyev Vaqif Kamil oğlu
Hacıyeva Ülviyyə Davud qızı
Həsənova Laçın Xalid qızı
Hüseynov Cahangir İslam oğlu
Kərimova Zülfiyyə Məhərrəm qızı
Qəribova Arifə Hacıbaba qızı
Mehbalıyeva Elnarə Cabir qızı
Məmmədov Razim Əli oğlu
Tağıyeva Zenfira Əsgər qızı
Umudov Qudrət Umud oğlu
Yusubov Fəxrəddin Allahverdi oğlu.

**İlham ƏLİYEV,**
**Azərbaycan Respublikasının Prezidenti**

*Bakı şəhəri, 17 dekabr 2021-ci il*

## C.Ə.CƏFƏROVA AZƏRBAYCAN RESPUBLİKASI PREZİDENTİNİN FƏRDİ TƏQAÜDÜNÜN VERİLMƏSİ HAQQINDA AZƏRBAYCAN RESPUBLİKASI PREZİDENTİNİN SƏRƏNCAMI

Azərbaycan Respublikası Konstitusiyasının 109-cu maddəsinin 32-ci bəndini rəhbər tutaraq və "Azərbaycan Respublikası Prezidentinin fərdi təqaüdünün təsis edilməsi haqqında" Azərbaycan Respublikası Prezidentinin 2002-ci il 11 iyun tarixli 715 nömrəli Fərmanına uyğun olaraq qərara alıram:

1. Azərbaycan Dövlət Pedaqoji Universitetinin 100 illiyi münasibətilə və Azərbaycanda təhsilin inkişafında xidmətlərinə görə Cəfər Əsəd oğlu Cəfərova Azərbaycan Respublikası Prezidentinin fərdi təqaüdü verilsin.

2. Azərbaycan Respublikasının Nazirlər Kabineti bu Sərəncamdan irəli gələn məsələləri həll etsin.

**İlham ƏLİYEV,**
**Azərbaycan Respublikasının Prezidenti**

*Bakı şəhəri, 17 dekabr 2021-ci il*

## AZƏRBAYCAN DÖVLƏT PEDAQOJİ UNİVERSİTETİNİN ƏMƏKDAŞLARINA "ƏMƏKDAR MÜƏLLİM" FƏXRİ ADININ VERİLMƏSİ HAQQINDA AZƏRBAYCAN RESPUBLİKASI PREZİDENTİNİN SƏRƏNCAMI

Azərbaycan Respublikası Konstitusiyasının 109-cu maddəsinin 32-ci bəndini rəhbər tutaraq qərara alıram:

Azərbaycan Dövlət Pedaqoji Universitetinin 100 illiyi münasibətilə və Azərbaycanda təhsilin inkişafında xidmətlərinə görə Azərbaycan Dövlət Pedaqoji Universitetinin aşağıdakı əməkdaşlarına **"Əməkdar müəllim"** fəxri adı verilsin:

Abdullayeva Zemfira Kəlpəli qızı
Axundov Asif Əbülfəz oğlu
Babayev Yaqub Məhərrəm oğlu
Bayramov İbrahim Məhəmməd oğlu
Cavadov Təyyar Salam oğlu
Cəfərov Heydər Allahyar oğlu
Daşdəmirov Arzu Oruc oğlu
Əliyeva Şəhla Qasım qızı
Əlizadə Nailə Mustafa qızı
Əlizadə Şükür Həmid oğlu
Fərəcov Araz Salamulla oğlu
Həsənov Vaqif Səməd oğlu
Hüseynova Mahirə Nağı qızı
İlyasov Müseyib İbrahim oğlu
İmanov Ənvər Niftulla oğlu
İsmayılov İsa Namaz oğlu
İsmayılova Mirvari Abbas qızı
Rzayev Fikrət Çingiz oğlu
Rzayev Rəhim Mikayıl oğlu
Sadıqova Nailə Məmməd Hüseyn qızı
Seyidli Həmzə Səməd oğlu
Səfərov Pərviz Şahin oğlu
Yusifova Anaxanım Əmiralı qızı
Zamanov Asəf Dağbəyi oğlu.

**İlham ƏLİYEV,**
**Azərbaycan Respublikasının Prezidenti**

*Bakı şəhəri, 17 dekabr 2021-ci il*

## AZƏRBAYCAN DÖVLƏT PEDAQOJİ UNİVERSİTETİNİN ƏMƏKDAŞLARININ "AZƏRBAYCAN RESPUBLİKASI PREZİDENTİNİN FƏXRİ DİPLOMU" İLƏ TƏLTİF EDİLMƏSİ HAQQINDA AZƏRBAYCAN RESPUBLİKASI PREZİDENTİNİN SƏRƏNCAMI

Azərbaycan Respublikası Konstitusiyasının 109-cu maddəsinin 32-ci bəndini rəhbər tutaraq qərara alıram:

Azərbaycan Dövlət Pedaqoji Universitetinin 100 illiyi münasibətilə və Azərbaycanda təhsilin inkişafında xidmətlərinə görə Azərbaycan Dövlət Pedaqoji Universitetinin aşağıdakı əməkdaşları **"Azərbaycan Respublikası Prezidentinin fəxri diplomu"** ilə təltif edilsin:

Əliyeva Tinatin Məmməd qızı
Qaraməmmədli Yasin Alı oğlu
Rəsulov Rəis Azər oğlu
Verdizadə Nailə Allahverdi qızı.

**İlham ƏLİYEV,**
**Azərbaycan Respublikasının Prezidenti**

*Bakı şəhəri, 17 dekabr 2021-ci il*

## AZƏRBAYCAN DÖVLƏT PEDAQOJİ UNİVERSİTETİNİN ƏMƏKDAŞLARININ TƏLTİF EDİLMƏSİ BARƏDƏ

### AZƏRBAYCAN RESPUBLİKASI TƏHSİL NAZİRİNİN ƏMRİ

Cari ildə Azərbaycanın təhsil tarixində xüsusi yeri olan Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) fəaliyyətə başlamasının 100 ili tamam olmuşdur. Azərbaycan Xalq Komissarları Sovetinin sədri Nəriman Nərimanovun 26 avqust 1921-ci il tarixli dekreti əsasında milli dildə fəaliyyətə başlayan bu ilk ali pedaqoji təhsil ocağı məktəbləri yüksək ixtisaslı pedaqoji kadrlarla təmin etmək məqsədilə yaradılmışdı.

Ötən müddət ərzində ADPU pedaqoji və elmi-pedaqoji kadr hazırlığı sahəsində üzərinə düşən missiyanı şərəflə yerinə yetirmiş, yalnız respublikamız üçün deyil, Gürcüstan, Mərkəzi Asiya respublikaları və digər ölkələr üçün elmi-pedaqoji kadr hazırlığını uğurla həyata keçirmişdir. Universitetin məzunları ölkəmizdə savadsızlığın aradan qaldırılması, maarifçilik ideyalarının təbliği və inkişafına böyük töhfələr vermişlər.

ADPU fəaliyyəti dövründə 160 mindən çox müəllim kadrı hazırlamış, bir çox ixtisaslar üzrə elmi-pedaqoji kadr hazırlığının mərkəzinə çevrilmişdir.

Hazırda ADPU ölkədə pedaqoji kadr hazırlığı ilə məşğul olan ixtisaslaşmış ali təhsil müəssisəsidir. Universitetin Ağcabədi, Cəlilabad, Quba, Şəki və Şamaxı filialları fəaliyyət göstərir, eyni zamanda Azərbaycan Dövlət Pedaqoji Kolleci də onun nəzdində kadr hazırlığını həyata keçirir. ADPU-da filiallar və Pedaqoji Kollec də daxil olmaqla 20 minə yaxın tələbə təhsil alır, 1700-dən çox pedaqoji və inzibati heyət çalışır. Onlardan 67 nəfəri elmlər doktoru, 61 nəfəri professor, 273 nəfəri dosent, 354 nəfəri fəlsəfə doktorudur. Universitetdə bakalavriat səviyyəsində 22, magistratura səviyyəsində 18 ixtisas üzrə pedaqoji kadr hazırlanır.

"Azərbaycan Respublikasının Təhsil Nazirliyi haqqında Əsasnamə"nin 8.43-cü və 13.5-ci bəndlərini rəhbər tutaraq, Azərbaycan Respublikası Təhsil Nazirliyinin 05 may 2021-ci il tarixli F-203 nömrəli əmri ilə təsdiq edilmiş Tədbirlər Planının 3-cü bəndinə əsasən **əmr edirəm:**

Azərbaycan Dövlət Pedaqoji Universitetinin 100 illik yubileyi münasibətilə və pedaqoji kadrların hazırlığı sahəsində səmərəli elmi-pedaqoji fəaliyyətlərinə görə Universitetin aşağıda adları qeyd olunan əməkdaşları təltif edilsinlər:

**"Azərbaycan Respublikası qabaqcıl təhsil işçisi" döş nişanı ilə**

1.Abbasova Zemfira İsaxan qızı
2.Abdinova Afiyət Əkbər qızı
3.Abdullayeva Cəmilə Novruz qızı
4.Abdurahmanova Gülnara Qurbanəli qızı
5.Abduyev Məhəmməd Abdu oğlu
6.Ağayeva Reyhan Mirhüseyn qızı
7.Alxasov Oqtay Kamil oğlu
8.Alıcanov Mayıl Sadyar oğlu
9.Alıyev Yusif İmrayıl oğlu
10. Alıyeva Günay Dilqəm qızı
11. Babayeva Yasəmən Nizam qızı
12. Balaşov Qulaməli Qurbanəli oğlu
13. Bayramov Kərəm Bayram oğlu
14. Cəbrayılov Bəyməmməd Saday oğlu
15. Cəlilova Sevinc Xazay qızı
16. Cəlilova Yeganə Qələndər qızı
17. Dadaşova Minarə Rəhim qızı
18. Əhmədov İlham Başir oğlu
19. Əkbərova Əsmayə Baxtiyar qızı
20. Ələsgərov Baxış İslam oğlu
21. Əliyev Bəhram Əli oğlu
22. Əliyev Həmzə Qəmbər oğlu
23. Əliyev Məhərrəm Sabir oğlu
24. Əliyev Sənan İsbəndiyar oğlu
25. Əliyev Vilayət Hüseyn oğlu
26. Əliyeva Flora Ələsgər qızı
27. Əliyeva Leyla Xudadat qızı
28. Əliyeva Sevinc İsrafil qızı
29. Əmirov Mübariz Mirəziz oğlu
30. Əsədov Mübariz Xasay oğlu
31. Əsədova Bəsti Qoşun qızı
32. Əsgərova Mətanət Mahmud qızı
33. Əzizov Qulam Qəribəli oğlu
34. Fərəcov Ədalət Nurulla oğlu
35. Həsənov Habil İsmiyəli oğlu
36. Həsənova Könül Nəriman qızı
37. Hidayətova Firəngiz Şahmurad qızı
38. Hüseynov Elmar Afis oğlu
39. Hüseynova Nailə Tofiq qızı
40. İmanov Allahyar Süleyman oğlu
41. İsgəndərov İsrayıl İsa oğlu
42. İsrafilov Vaqif İsmayıl oğlu
43. Kazımov Zahir Fərhad oğlu
44. Kazımova Nurlana Nurəddin qızı
45. Kərimova Firəngiz Yəhya qızı
46. Qafarova Jalə Rəhman qızı
47. Qasımov Himalay Ənvər oğlu
48. Qasımova Mirvari Məmməd qızı
49. Qədimova Qumral Çingiz qızı
50. Qəhrəmanova Qızxanım Nizaməddin qızı
51. Quliyeva Kəmalə Rüstəm qızı
52. Quliyeva Mətanət Şəmsəddin qızı
53. Quliyeva Sevinc Bəbir qızı
54. Qurbanov Vəli Məhərrəm oğlu
55. Mahmudov İsmayıl Şamil oğlu
56. Mahmudova Ədilə Əli Yoldaş qızı
57. Mazanova Səadət Baybala qızı
58. Məcidov Mobil Kamil oğlu
59. Məmmədov Xankişi Bəxtiyar oğlu
60. Məmmədov Vurğun Rəhim oğlu
61. Məmmədova Svetlana Nəsib qızı
62. Mikayılov Şəsəddin Sabir oğlu
63. Musayeva Səadət Müseyib qızı
64. Mürsəlbəyova Lalə Vaqif qızı
65. Nağıyeva Nahidə Həsən qızı
66. Nəsirov Novruz Baba oğlu
67. Nəzərov Müslüm Hətəm oğlu
68. Novruzova Gülşən Fəxrəddin qızı
69. Paşayeva Pəri Şəmsəddin qızı
70. Pirverdiyeva Könül İsaq qızı
71. Rəsulov Rafiq Abduləli oğlu
72. Rəsulov Zakir Qəmbər oğlu
73. Sadıqov Rəşad Əsəd oğlu
74. Səfərov Rəhman Saleh oğlu
75. Səmədova Könül İbrahim qızı
76. Sultanlı Xudayar Həzərxan oğlu
77. Sultanov Rauf Lütvəli oğlu
78. Sultanova Zöhrə Rza qızı
79. Şahverdiyeva Aleyyaxanım Cavid qızı
80. Şeydayeva Aysel Balasultan qızı
81. Şirinov Kamil Lətif oğlu
82. Tağıyeva Samirə Cəmil-Cahid qızı
83. Verdiyeva Mirvari İdris qızı
84. Vəzirova Leyla Orxan qızı
85. Yusifova Tünzalə Vəli qızı
86. Zalov Əli Zal oğlu
87. Zeynalov Sahib Adıgözəl oğlu

**"Azərbaycan Respublikası Təhsil Nazirliyinin Fəxri Fərmanı" ilə**

1. Abdullayev Eldar Əbülfəz oğlu
2. Abdullayev Səməd İsmayıl oğlu
3. Acalova Naidə Andam qızı
4. Ağabəy Gülşən Şıxmurad qızı
5. Axundova Sevda Hidayət qızı
6. Alıyev Fəxrəddin Qurban oğlu
7. Aslanova Nigar Qalib qızı
8. Babayeva Gülnarə Vəli qızı
9. Babayeva Samirə Oqtay qızı
10. Balıyev Adil Həsən oğlu
11. Budaqov Telman Şamiloviç
12. Cəbrayılzadə Sabiyə Məlik Məmməd qızı
13. Cəfərov İsa Ağa oğlu
14. Dadaşlı Yadulla Beydulla oğlu
15. Dadaşov Canəmir Vəliməmməd oğlu
16. Əfəndiyeva Kəmalə Qafar qızı
17. Əhmədov Yusif Kərəm oğlu
18. Əhmədova Şəfa Fizuli qızı
19. Əkbərov Nizami Əlisahib oğlu
20. Əliyev Rəhim Süleyman oğlu
21. Əliyeva Dilbər Zirək qızı
22. Əliyeva Xuraman İskəndər qızı
23. Əliyeva Sevinc Akif qızı
24. Əsgərova Könül Rəşxan qızı
25. Fərmayılov Anar Hümbət oğlu
26. Hacıyev Allahverdi Şəmistan oğlu
27. Heydərova Aygün Eyyub qızı
28. Həmidova Xalidə Aydın qızı
29. Həsənova Afət İbrahim qızı
30. Həsənova Natavan Filman qızı
31. Həsənova Solmaz Hüseyn qızı
32. Həsənova Zinharə Fərhad qızı
33. Hüseynova Hacər Emin qızı
34. Xəlilov Vüsal Əmirxan oğlu
35. İbrahimova Xoşqədəm Qonaq qızı
36. İsayev İramin Namaz oğlu
37. İsayeva Sürayyə Maqsud qızı
38. İsgəndərov Tofiq Əliağa oğlu
39. İsmayılov Qaçay Köçəri oğlu
40. İsmayılov Vaqif Nüsrət oğlu
41. Kazımov Asəf Əsəd oğlu
42. Qafarova Nigar Heydər qızı
43. Qaralova Rəna Nəsrəddin qızı
44. Qədirova Ülkər Məhəmməd qızı
45. Qəhrəmanova Yeganə Qürbət qızı
46. Qəribova Qəmərxanım İsmayıl qızı
47. Quliyev Arzu Məsim oğlu
48. Quliyev Kərim Əvəz oğlu
49. Quliyeva Aygün Nadir qızı
50. Quliyeva Leyli Danilovna
51. Mahmudova Rəsmiyyə Nəriman qızı
52. Mədədov Polad Yadulla oğlu
53. Məhərrəmova Günay İsmayıl qızı
54. Məmmədov Fəxrəddin Emin oğlu
55. Məmmədov Sabir Rüstəm oğlu
56. Məmmədov Tofiq İsa oğlu
57. Məmmədova Gülnarə Famil qızı
58. Məmmədova İsmət Məmməd qızı
59. Məmmədova Şəfa Ağa qızı
60. Məstəliyev Vaqif Yusif oğlu
61. Muxtarova Simuzər Şövkət qızı
62. Muradova Elnarə Müzəffər qızı
63. Nağıyev Zakir Saleh oğlu
64. Nəsirov Elnur Güləhməd oğlu
65. Nəsirov Vaqif İbad oğlu
66. Novruzova Nazəni Aslan qızı
67. Orucova Dildadə Həmid qızı
68. Pələngov Əbülfət Qulam oğlu
69. Rəhimova Mənzilə Ağarəhim qızı
70. Rüstəmov Çingiz Ataxan oğlu
71. Rzayeva Yaqut Tosif qızı
72. Seyidova Şəlalə İltizam qızı
73. Səmədzadə Rauf Hüseyn oğlu
74. Süleymanov Seymur Elman oğlu
75. Süleymanova Dilgüşə Cəmiyyət qızı
76. Şərifov Qalib Mövsüm oğlu
77. Şirəliyeva Sevil Mustafa qızı
78. Vəliyeva Zülfiyyə Əlisaab qızı
79. Zeynalova Zülfiyyə Ağarəhim qızı

**Emin Əmrullayev,**
**Azərbaycan Respublikasının təhsil naziri**

**Əmr № 1535**
**Bakı şəhəri,**
**29 dekabr 2021-ci il**

Tiraj - 500
Şəhadətnamə - № 191

# GƏNC MÜƏLLİM QƏZETİ



ADPU 100

## YUBİLEY NƏŞRLƏRİ

*Azərbaycan Dövlət Pedaqoji Universitetinin 100 illik yubileyi münasibəti ilə universitetimizin alimləri, əməkdaşları, magistrantları, müvafiq strukturları tərəfindən 8 adda müxtəlif səpgili əsərlər hazırlanaraq nəfis tərtibatda yüksək tirajla nəşr edilib. O cümlədən, bir əsrlik tarixi irsin təbliği məqsədi ilə ADPU-nun müvafiq filial, fakültə və kafedralarında da bu strukturların tarixini və fəaliyyətini əks etdirən nəşrlər hazırlanmışdır. "Gənc Müəllim" Pedaqoji Universitetin yubiley nəşrlərini təqdim edir:*




**"Azərbaycan Dövlət Pedaqoji Universitetinin tarixi (1921–2021)" (iki cilddə). Bakı, ADPU, 2021, (I cild – 384 səh., II cild – 248 səh.)**

Professor Fərrux Rüstəmovun müəllifi olduğu irihəcmli əsərin I cildində ADPU-nun təşəkkülü və inkişafının bir əsrlik tarixi zəngin elmi mənbələr və arxiv sənədləri əsasında şərh olunur. Azərbaycanda ziyalı təbəqəsinin və elmi-pedaqoji potensialın formalaşmasında, yüksəkixtisaslı müəllim kadrlarının hazırlanmasında universitetin müstəsna rolundan bəhs olunur.

II cilddə hazırda universitetin müasir idarəetmə strukturu - rektorluq, prorektorluq, fakültələr, kafedralar, şöbələr və bölmələr, SABAH qrupları, filiallar, müstəqil fəaliyyət göstərən qurumlar (Həmkarlar İttifaqı Komitəsi, Tələbə Həmkarlar İttifaqı Komitəsi, Tələbə Gənclər Təşkilatı, Türk Tələbələrinin İdarəetmə Şurası, Türk odası, poliklinika və s.) və Azərbaycan Dövlət Pedaqoji Kolleci haqqında məlumatlar öz əksini tapmışdır.

Kitab təhsil tarixçiləri, tədqiqatçılar və geniş oxucu kütləsi üçün nəzərdə tutulmuşdur.

**"Azərbaycan Dövlət Pedaqoji Universitetinin professorları". Bakı, ADPU, 2021, 544 səh.**

Kitabın müəllifi professor Fərrux Rüstəmovdur. Əsərdə Azərbaycan Dövlət Pedaqoji Universitetinin bir əsrlik tarixi onu yaradan, inkişaf etdirən və sabaha aparan alimlərin - SSRİ EA-nın, SSRİ PEA-nın, AMEA-nın həqiqi və müxbir üzvlərinin, elmlər doktoru və professorların simasında təqdim edilir.

Kitab tələbələr, müəllimlər və tədqiqatçılar üçün nəzərdə tutulmuşdur.

**"Azərbaycan Dövlət Pedaqoji Universitetinin rektorları". Bakı, ADPU, 2021, 312 səh.**

Professor Fərrux Rüstəmovun bu əsərində təhsil ocağının təşkilində, inkişafında və idarə edilməsində mühüm xidmətləri olan 31 rektor (direktor), həmçinin Ali Pedaqoji İnstitutun nəzdindəki A.Şaiq "Nümunə məktəbi"nin müdiri Qafur Əfəndizadə, Ali Pedaqoji Qadın İnstitutunun ilk və son direktoru Sara xanım Xuramoviç haqqında oçerklər verilmişdir.

Kitab ali pedaqoji təhsil tədqiqatçıları, müəllimlər, metodistlər, təhsil təşkilatçıları, habelə təhsil tarixi ilə maraqlananlar üçün nəzərdə tutulmuşdur.

**"Azərbaycan Dövlət Pedaqoji Universitetinin 100 məşhur məzunu". Bakı, ADPU, 2021,168 səh.**

Professor Asəf Zamanovun müəllifi olduğu kitabda ADPU-nun məşhur məzunları – AMEA-nın prezidentləri, vitse-prezidentləri, həqiqi üzvləri, müxbir üzvləri, dövlət xadimləri, generallar, əməkdar elm xadimləri, xalq şairləri, xalq yazıçıları və başqaları haqqında ensiklopedik məlumat verilir.

Kitab tədqiqatçılar, müəllimlər, elm və təhsil təşkilatçıları, həmçinin təhsil tarixi ilə maraqlananlar üçün dəyərli vəsaitdir.

**"Azərbaycan Dövlət Pedaqoji Universitetinin Qəhrəmanları (ensiklopedik toplu)". Bakı, ADPU, 2021, 304 səh.**

Pedaqoji Universitetin yarandığı gündən bu günə qədər yetişdirdiyi 160 mindən çox yüksəkixtisaslı məzunları respublikamızın ümumtəhsil tarixində həlledici rola malik olmaqla ölkə təhsilinin əsas dayaqlarından birinə çevrilmişdir. Eyni zamanda universitetin məzunları arasında onlarla görkəmli elm, mədəniyyət və ictimai xadimlərin adlarını çəkmək olar. Ensiklopedik topluda həmin tələbə və məzunların, o cümlədən ali təhsil müəssisəsinə rəhbərlik edənlərin xüsusi bir qrupu, canlarını və qanlarını Vətən yolunda fəda edən qəhrəmanlarla tanış olacaqsınız. Əsərin müəllifi universitetin redaktoru Taleh Mirzəyevdir. Kitab ADPU-nun 100 illik yubileyi münasibətilə Vətən yolunda canını fəda etmiş əziz şəhidlərimiz və qazilərimizin həmişəyaşar xatirələrinə həsr olunur.

**"AZƏRBAYCAN DÖVLƏT PEDAQOJİ UNİVERSİTETİ. 100 ilin şahidləri. FOTOALBOM". Bakı, ADPU, 2021, 216 səh.**

Taleh Mirzəyev tərəfindən tərtib edilən fotoalbomda Azərbaycan Dövlət Pedaqoji Universitetinin keçdiyi bir əsrlik zəngin elmi-pedaqoji yol zəngin arxiv materialları əsasında fotoların dili ilə xronoloji ardıcıllıqla təqdim olunur. Fotoalbomu vərəqlədikcə oxucuda universitetin zəngin keçmişi və parlaq sabahı haqqında aydın təsəvvür yaranır. Əsəri bir növ universitet haqqında sənədli film səciyyəsi daşımaqla 100 illik tarixin xülasəsi də adlandırmaq olar.

**"Azərbaycan Dövlət Pedaqoji Universiteti. 100 il 100 fakt". Bakı, ADPU, 2021, 108 səh.**

Azərbaycan Dövlət Pedaqoji Universiteti 100 illik tarixi boyu olduqca zəngin və bir-birindən maraqlı elmi-pedaqoji, ictimai-siyasi hadisələrə şahidlik etmiş, ali təhsil müəssisəsi fəaliyyəti dövründə bir çox uğurlara imza atmış, eyni zamanda mürəkkəb tarixi inkişaf yolu keçmişdir. Universitet bu gün də ölkədə pedaqoji kadr hazırlığının bayraqdarı kimi öz missiyasını uğurla davam etdirir.

ADPU-nun pedaqogikanın nəzəriyyəsi və tarixi ixtisaslaşması üzrə I kurs magistrantı Asim İbrahimovun tərtib etdiyi bu albom-kitabda Universitetin bir əsrlik zəngin tarixi ən maraqlı 100 fakt işığında qısaca göz önündə canlanır. Faktlar bilavasitə əlaqədar olduğu fotolar və illustrativ tərtibatla təqdim olunur.

## Yubiley poçt markası dövriyyəyə buraxılıb

Azərbaycan Respublikası Rəqəmsal İnkişaf və Nəqliyyat Nazirliyinin tabeliyində fəaliyyət göstərən "Azərpoçt" MMC tərəfindən Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) 100 illik yubileyinə həsr olunan yeni poçt markası dövriyyəyə buraxılıb. Buraxılış 2 markadan ibarət blok şəklindədir. Poçt markası ilə yanaşı 200 ədəd Birinci gün zərfi də hazırlanıb. Marka 3 min tirajla Belarus Respublikasının Bobruysk şəhərində çap edilib.

Markanın müəllifi rəssam Orxan Qarayevdir. Markaların dizaynı ADPU-nun mütəxəssisi Elvin Vahidova məxsusdur.






Qəzet "Gənc Müəllim" qəzetinin redaksiyasında yığılıb, səhifələnib və "Azərbaycan Nəşriyyatı"nda çap olunub. Sifariş №: 42

Ünvan: Bakı şəhəri, Səbail rayonu, Ü.Hacıbəyli küçəsi, 68 / Əlaqə: +994 50 868 08 33 / Qəzetdə qeyd edilən faktlara görə redaksiya məsuliyyət daşımır.